# Molla Nəsrəddin



# ملا نصرالدّین

Hazırladı: Cavid Ağa

حاضرلادی: جاوید آغا

1910 **Beşimci il** 03.01 1910 г.

# ملا نصرالدین

№1 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 1



### QӘZӘL

Zahid ölmәkdәn qabaq mәqsudinә çatmaq dilәr,
Cәnnәtә uyğu ipilә bir kәmәnd atmaq dilәr.
Etiqadınca yatar-yatmaz qucar qılmanları,
Ol sәbәbdәndir namaz üstündә dә yatmaq dilәr.
Әblәhin fikrincә cәnnәt bir Buxara şәhridir,
Bәççәtәk qılmanları bulduqca oynatmaq dilәr.
Mәqsәdi sövmü sәlatından bu imişkәn, yazıq,
Hәm xudanı, hәm dә mәxluqatı aldatmaq dilәr.
Uyquda axtardığın hazirdә, yarәb, tapmasın,
Yoxsa illik taәtin bir yolluğa satmaq dilәr.
Rindi-risva gördüyün zahid görәrsә, şübhәsiz,
Sәbhәsin, sәccadәsin zöhd ilә fırlatmaq dilәr.
Küfrün iksir olduğun zahid, amandır, bilmәsin,
Yoxsa bir zәrrә bulub imanına qatmaq dilәr.

*Ağlar Gülәyәn*

## ƏDƏBİYYAT

Mən allam ələ indi qələmdanı, a Molla!
Rüsva edərəm yekcə bu dünyanı, a Molla!

---

Bu kimdi yazıb Mirzə Hüseyn Vaizə şöylə:
Aç məktəbini, etmə bu cövlanı, a Molla!?

---

Bir vəqtdə həm natiqü həm mərsiyəxanəm,
Kim görmüş idi böylə əzaxanı, a Molla?!

---

Məşrutə zamanında ki, mən vəz qılardım,
Hər minbərimin bir tümən ünvanı, a Molla!

---

Həzrət özü ruzi eləyib indi vəkalət,
Çün lazım idi mən kimi ruhani, a Molla!

---

Nisvan sözü islamda heç vəqt deyilməz,
Söylənsə əgər, məhv edər imanı, a Molla!

---

Gər kimsə desə, mən edərəm qətlini vacib,
Onda olaram alimi-rəbbani, a Molla!

---

İcrai-şəriətdən ötür xeyli çalışdım,
Məhbus elədim Seyyid Hüseynxanı, a Molla!

---

Girəm ki, çalışdım özümə rəy çıxartdım
Məmnun elədim düşməni-vicdanı, a Molla.

---

Laməzhəblər qoysala bir az, yer üzündən
Mədum edərəm əyri qabırğanı, a Molla!

---

Həm vaizü həm natiqü həm güclü vəkiləm,
Tünd işlədirəm indi dəyirmanı, a Molla!



Gər məmləkətü millətimiz məhv olur, olsun,
Allahdır onun əsl nigəhbanı, a Molla!

Mən getdim elə rövzeyi-rizvanı, a Molla!
Əhya elədim dini-müsəlmanı, a Molla!

*Təbriz. Tambrançı*

## KƏŞFİYYAT ELMİ

Təbrizin əzayi-əncüməninin kəşf etdiyinə görə, hər kəs gözlərini bərk-bərk yumsa, onu heç kəs görə bilməz.

Əxfa elmini axtaran dərvişlərə xəbər olsun. Bunun dəlili üçün Əncümən hökuməti qərar verib ki, xaric dövlətin əlindən qurtarmağa çarə ruznamənin olmamağıdır. Əgər olsa da İran işlərindən onda bir şey yazılmaya, ondan ötrü biz əgər qələmə azadlıq versək, özgə millətlər bizim eyiblərimizi bilib, bizim işlərimizə dəxalət edərlər. Əncümən ağaları özlərini Təbrizdə yazılan ruznamələrə senzur qərar verib ki, onda adətə toxunan mətləb yazılmasın. Gələn dəfəki seçkiyə qərar verilib: on iki nəfər qırmızısaqqal tələbə Sadiqiyyə mədrəsəsinə sifariş verilsin, yoxsa beş molla Əncümənə kifayət verməz.

*Babi müstəbid*

## SƏHV

Bu gün mən bədbəxt az qalmışdım bir böyük səhv edəm. Bir qəzetin üçüncü nömrəsinin əvvəlinci səhifəsində başdan yekə hərflər ilə yazılmış idi:

**Ətəbati-aliyyət**
Üləmayi-üzamın öhdələrinə tərəttüb edən vəzifələr

Bu sərlövhənin altında bir uzun məqalə yazılıb. Qəzetəni poçtda aldım, qoydum cibimə ki, evdə oxuyam, yolda evə gələ-gələ qəzetəni açdım ki, görüm Əhməd bəy üləmanın vəzifələri barəsində nə yazır.

Səhifənin ortasında bir belə sözlər gözümə sataşdı:

«Zahiri əsarətdən xilas olduğumuz kimi batini əsarətdən də xilas olmalıyız, çünki istibdadın əsil əsası və binaları şu batini əsarətdir».

Bu sözləri yolda oxuyan kimi mən yəqin elədim ki, Əhməd bəyin məqaləsində batini əsarətdən murad təqlid məsələsidir. Və evə gəlib Lağlağıya dedim ki, «Əhməd bəy bu gün bir söz danışıb, amma bu sözdən qan qoxusu gəlir».

Lağlağı dedi ki, «ağlım kəsmir».

Qəzetəni açdım və məqaləni başdan axıra kimi oxudum. Nə gördüm? Mən elə bildim ki, Əhməd bəy yazacaq:

«Üləmayi-üzamın vəzifələri budur ki, biçarə müsəlmanlardan əl götürüb onları batini əsarətdən qurtarsınlar».

Amma xeyr, mən binəva böyük səhv eləmiş imişəm: Əhməd bəyin yazdığı özgə bir mətləbdir.

Mən bədbəxt nə böyük səhv elədim?

*Molla Nəsrəddin*

## HÖRMƏT

Bu zəhrimar məşrutə çıxandan bu yana hörmət-zad lap götürülüb və küçələrdə gəzən balaca uşaqlar az qalıblar ki, böyüklərin və ağsaqqalların üzünə duralar.

Dünən Naxçıvandan bir belə teleqraf gəlib ki, bir məclisdə Məhəmməd Cəfər ağanı Şeyx Kərimdən üç adam aşağı oturdublar.

Bunların hamısı bu zəhrimar məşrutənin bəlasıdır.

## MƏHƏRRƏM XƏBƏRLƏRİ

Öz müxbirlərimizdən gələn teleqraflar:

Culfa – Bu ay içində üç mindən artıq mərsiyəxan və sinəzən professorları İrandan Rusiya torpağına keçib, Qafqazın hər tərəfinə yayıldılar.

İrəvan – «Yezid»lik mənsəbi üçün yüzdən artıq kandidat var. Bu mənsəb üstə iğtişaş gözlənir. Buna görə şəhərin hər tərəfinə indidən əsgər qoyulub ki, hökumətə bir zərər gəlməsin.

Şamaxı – Dövlətli ağalar məktəb şagirdlərinə üç min ağ köynək ehsan elədilər.

Mərv – Aşura günü üçün Berlinə sifariş edilən ağ göyərçinlər hələ gəlmədi. Camaat çox həyəcandadır.

Tiflis – Rus qəzetələri uzun məqalələr yazıb hökumətə isbat edirlər ki, İrandan gələn professorlar hərçənd məhərrəmliyi bəhanə edib gəliblərsə də, qəsdləri özgədir. Şəkk yox ki, onlar belə bir vaxtda onun üçün gəliblər ki, Rusiyanın İran barəsində olan məslək və politikasını və bura müsəlmanlarının ruhunu yaxından görüb anlasınlar. Rusiya məmurlarına lazımdır ki, sərvəqt olsunlar.

Ərdəbil – Şahsevən müsəlmanları bu il keçən illərdən artıq məhərrəm tədarükü görürlər. Deyilməyə görə, bu il iki yüzdən artıq «başkəsən dəstəsi» təşkil olunacaq.

Nəcəfül-əşrəf – Bir ay əvvəl, üç müctəhid Ərdəbilə getdi ki, aşura günü olacaq mitinqlərə nəzarət etsinlər.

Təbriz – Vaxtilə qovulan müctəhid Mirzə Həsən ağanın Əncümənin dəvətilə yaxında şəhərə gəlməyi gözlənir.

Gəncə – Seyid Bağır ağa ilə Molla Məşum həzrətləri baş yarmaq dəstələrini qubernatordan əvvəl mən etmək istəyirlər.

Ordubad – Hansı şəhərə «Yezid» lazım olsa, burdakı «Ağ seyidlər kompaniyası» ucuz qiymətə göndərməyə hazırdır.

Rəşt – Hökumət qoşunu Ərdəbili fəth edib qurtardıqdan sora dəxi buralarda bir işi qalmadığından, tezcə Tehrana gedir ki, aşura günü olacaq ümumi «manevrə»də iştirak etsin.

Təbriz – Əncümən qərar qoydu ki, şahsevənlərin acığına nə qədər sərbaz varsa, aşura günü hamısı təlim

Məscid

Qasim otağı

Ağam vay, vətən vay, dədəm vay, Ərdəbil vay! Baş yarax, intiqam alax, ağam vay, vətən vay!

Ərdəbildən Təbrizə.

meydanına yığılıb «baş yarmaqla» intiqam alsınlar. O günü cümlə konsullar da hazır olacaqlar ki, təlimin nəticəsini öz hökumətlərinə bildirsinlər.

Bakı – Qradanaçalnik məhərrəmlikdə baş yarmağı qadağan etməyə görə, mollalar xəlvətcə camaatı dəvət edirlər ki, hamamlara yığışıb ülgüc ilə başlarını çərtsinlər.

## NƏ DEYİM

Ax, kaş dünyada müsəlmanlardan savayı heç bir kəs olmayaydı və gündə bir qabağımızı kəsib soruşmayaydı ki: «o nədir» və «bu nədir».

---

Budur, məscid tərəfində mərəkədir. Uzaqdan eşidirəm ki, oxuyurlar:

«Ey şiələr, gəlin şuri-nəvayə...»

Budur, tanışlarımdan bir nəfər rus yanımı kəsib soruşur ki, «Sizin müsəlmanlar bu gün niyə bu qədər başlarına vururlar? Yoxsa bunlar iranlılardır ki, vətənlərinin halına ağlayırlar?»

Allah xatirinə, ay şiələr, bir məni başa salın görüm bu rusa nə cavab verim və nə deyim?..

---

Hələ mən bilmirəm ki, xalqın biznən nə işi var?

Dünən bir erməni məndən soruşur ki, Naxçıvanda filan hacı niyə 22 lirə pulu göndərir müftəxor müctəhidə?

Deyirəm: ondan ötrü ki, hacı Allah bəndəsidir, mömindir, səxavətlidir, dindardır və xülasə. Gör nainsaf erməni mənə nə cavab verir, mənə deyir ki: «Asma, din haqqı, İsa haqqı, o hacı ki, müctəhidə 22 lirə göndərib, keçən il o rusa pambıq satanda pambığın içinə altı dənə köhnə kişmiş meşoku soxmuşdu ki, pambıq ağır gəlsin. Pambıq alan hacının fəndini duyub bir çox adam içində hacının üzünə tüpürdü».

İndi mən bilmirəm erməniyə nə deyim və nə cavab verim?..

*«Dəli»*

---

## TƏZƏ İL

Təzə il gəldi, yetişdi, amma doğrusu köhnə ilə çatmaz. Məsələn, keçən il məscidlərimizin ehtiramı artıq dərəcədə idi, amma bu il Bakıda da, Gəncədə də müsəlmanları məscidə zornan çəkib gətirirlər, keçən il İrəvan məscidində məhərrəmlikdə elə bir cəlal var idi ki, əcnəbilər uzaqdan baxıb həsəd aparırdılar.

Məsələn, keçən il məhərrəmlikdə iki zaviyədə və iki şəbistanda yüz pud şəkər işlənib, bir gecədə samavarlara min beş yüz sənək su daşınıb, hər gecə iki boçka neft yanıb, iki pud qəlyan tənbəkisi məsrəf olunub.

Amma bu il, rəvayətə görə, o qədər hazırlıq görsənmir. Hacı Nəcmüddövlənin təqvimində də bu təzə ili pis yazıblar. Genə bərəkət keçən ilə.

*Cırcırama*

---

## TƏBRİZ XƏBƏRLƏRİ

«Şirkəti-himayeyi-füqəra» tərəfindən təftiş olunan iki yüz nəfər on sinnindən on beş sinninə qədər qızların məktəbi-füqərayə götürülməsini Əncümən haram bilib, genə qərari-sabiqnən qızların sərbazxanaların mənzillərində yatmaqların təsvib elədilər.

---

Rusiya tərəfindən inqilab zamanı min tümən qarət eliyənlərə sərtiblik və iki min eliyənlərə mirpənclik, on min eliyənlərə əmirtümənlık, ya da müavinlik, yüz min qarət eliyənlərə şahlıq verildi. Bu qərar ilə üç min sərtib, altı min əmirtümən, iki müavin, doxsan doqquz şah var.

---

Kəc qabırğa tərəfdarı Seyid Hüseyn xanın əhlüəyalının və xırdaca balalarının su və çörəklərinin kəsilməyi xüsusunda Əncüməndə müzakirə olunub, Mirzə Hüseyn və Seyidül-mühəqqiq onların qırılmaqların istəyir.

---

Mirzə Hüseyn altı il bundan əvvəlki məktəbin fələqqəsin Əncümənə vəqf elədi.

Seyidül-mühəqqiqin xanə şagirdi Nasir Həzrət Əncümənə vəkil olandan Seyidül-mühəqqiqi saymır. Deyir: sən bir ağa, mən də bir ağa.

## URMİ

Az qalmışdı burada sair bələdiyyə və ədliyyə idarələri kimi mürəttib bir idareyi-nəzmiyyə açılsın, lilləhül həmd polislərin üç firqə və otuz fikrə ayrıldıqları bu işə mane oldu.

## ELAN

Yeni açdığımız fabrikada çox müqtədir «xəfiyyə» danosçu yetişdirirəm. O qədər müqtədir ki, Sultan Əbdülhəmid kimi yüz min dənə Sultan Əbdülhəmid ola, genə mənim kimi bu işdə mahir ola bilməz. «Məktəb»i, məktəb mənfəətinə olan qutuları və məscidi bağlatmaq və camaat arasında nə olsa birin üstünə on da qoyub yalandan böyüklərə demək və əlhasil hər cürə millətimizə faydalı işlər varsa fabrikamda mövcuddur.

Xahiş edənlər bu adresə müraciət buyursunlar:

*Göyçay: Qəmişüddövləzadə Kərbəlayı Səməd*

## ŞEYX

Dağıstanın «Taşlı» məhəlindən neçə illərdir ki, «elmsiz bikar bir yekə nəfər – cahil, biar, zorbaca bir xər» Dübür İsa adlı bir şeyx çıdan qırıb gəlir düz Qovaxçöl kəndinə və «Gözəl xala» kimi burada başlayır şeyxlik eləməyə. Hərçəndi həmin kəndin «Çopur Ömər» kimi kəmetiqadları şeyxin əmali-qəbihəsini bilib məzkuru o kənddən çıxartmağı öz camaatına bir neçə kərə tövsiyə edibsə də, camaatın əksəri mömin və cahil olduqlarından Şeyx İsa Dübür ilə behişt səfərinə hazırlanırdılar. Həmin kəndin möminə övrətləri kəmali-ədəblə hər gün Dübür İsanın xidmətinə bərəkət almağa gəlirlərmiş. Sora il dolanır, ay batır... İsa Dübür şıllağ atır. Axır bir ay bundan müqəddəm biri gözəl, digəri bir az çirkin iki nəfər cavanə gəlinlər Şeyx İsa Dübürün xidmətinə gəlirlər. Cənab Şeyx çirkin gəlini çöldə qoyub gözəl gəlini çəkir öz otağına, burada məzkurə gəlini özü ilə dizbədiz oturdub və başını aşağı salıb başlayır müraqibəyə. Məzlumə gəlin Şeyx İsa Dübürün kəramətini görən kimi daban alır evlərinə. Haman kəndin bir para adamları bu kəraməti eşidən kimi dərhal gedib Piləkənddə olan Şeyx İsanın qardaşına təvəqqe ediblər ki, gəlib Şeyx İsanı Qovaxçöldən aparsın, çünki o kənd kafi dərəcədə bərəkətlənibdir...

Allah Dağıstanın himar və tənbəl və biar adamlarına, yəni şeyxlərə ömür versin.

*Sofi Zənbil*

---

## TELEQRAF

Sabunçu – Məhərrəmül-həram yavuqlaşdığı üçün şair Mirzə Səməndər cənabları şəbeh dəstgahını düzəltmək üçün Dərbənd şəhərinə azim oldu.

---

## QƏRİB

Möhtərəm Molla Nəsrəddin əmi! Mən Gəncə şəhərinə təzə varid olmuş bir qəribəm və buradan istəyirəm sizə bir neçə söz yazam. Bir axşam mənzildə oturmuşdum, gördüm küçədə bir taraq-turuq, bir vurhavur və bir qoyma-qoyma düşdü ki, elə bil 1905-ci il geri qayıtdı. Doğrusu, Molla əmi, mən bir az qorxan kimi oldum və sonra ürək verib əlimə məhərrəmlik çomağını alıb yüyürdüm küçəyə, gördüm yuxarıdan bir xeyli camaat gəlir, özümü gücilən saldım bu camaatın içinə və yavaşcadan yanımdakı adamdan xəbər aldım: bacı oğlu, bu nə taraq-turuqdur? Dedi ki: axmaq, belə bu toydur, toy, masqara deyil, tapança və tüfəng atmaq qadağan olduğuna görə, Gəncənin igid cavanları urusun acığına qapıları daşlayırlar. Dedim: bacı oğlu, yaxşı deyirsən. Bu toydur və toya adam tamaşaya çıxar. Bəlkə qapıda adam oldu, onda necə? Dedi: pəh, cəhənnəmə olsun, gora olsun, qapıda durmasın, daş da dəyməsin. Biz nə eliyək? Dedim: yenə nə tövr olsa, gərək insan işi mərifət ilə tutsun. Dedi: rəhmətliyin oğlu, xəlq nə qoyub, sən nə axtarırsan? Bəri gəl, gədək, gör nələr görəcəksən. Mənim ətəyimdən tutdu və çəkə-çəkə apardı. Amma, vallah, ayaqlarım gedirdi, ürəyim heç getmirdi. Çünki qorxurdum o daşın biri də mənə dəyə. Dəxi nə qədər elədi getmədim. Doğrusu, qorxdum.

*Qərib*

---

## HACITƏRXAN

Müsəlman şəhərlərinin çoxunda bir «cəmiyyət» və bir «qəzet» olmadığı halda, bizim Hacıtərxanda, həmd olsun, iki cəmiyyət və iki qəzet var: Şurayi-islam, Cəmiyyəti-islamiyyə, «Bürhani-tərəqqi», «Edil».

Bu iki cəmiyyət və qəzet meydana gəlib tərəqqi edəndən bəri pək çox işlərimiz də tərəqqi etməkdədir. Məsələn:

1. – Kitabət, yəni danos yazmaqlıq.

Bu sənət bura müsəlmanları arasında o dərəcə tərəqqi edib ki, mislini heç bir şəhərdə görmək mümkün deyil.

«Reç» qəzetinin yazmağına görə, müsəlmanlar tərəfindən qubernator divanxanasına verilən danoslar o qədər çox imiş ki, poçta götürə bilmədiyindən, qubernator onları ayrı bir vaqon ilə Peterburqa polisa departamentinə göndərib ki, Pruşkeviç və qeyri Duma vəkilləri görüb şad olsunlar.

2. – Məhəbbət. Yerlilər ilə gəlmə müsəlmanlar bir-birlərinə elə məhəbbət göstərib qucaqlaşıblar ki, arada qalan biçarə «İttifaq» və «İttihad»ın başı-gözü əzilib canı çıxmaqdadır.

3. – Hörmət. Mollalar müəllimləri o mərtəbə yuxarı ucaldıblar ki, biçarələrin ayaqları məktəblərdən dişarıda, başları millətpərəst cənab İshaq İsgəndərovun ayaqları altında qalıb.

4. – Mətbuatın tərəqqisi. «Bürhani-tərəqqi» ilə «Edil» qəzetləri ancaq Şurayi-islam ilə Cəmiyyəti-islamiyyənin bitib-tükənməyən qalmaqallarına məxsus olduğundan yaxında təzə qəzetlər çıxacaq ki, özgə əhvalatdan da bəhs etsinlər.

5. – Misyonerlik. Gilan məhəlləsinin imamı Əbdürrəhman Həzrət Əliyevin, Qara Məscid imamı Saleh həzrətin və Kərim mollanın «təkfirləri» sayəsində Hacıtərxanda xristianların sanı qarışqa kimi artmaqdadır.

İdarədən: «Xalis rus cəmiyyəti»nə məsləhət görürük ki, rus misyonerlərinə nahaq yerə pul verib zəhmət çəkməsinlər. Bizim xalis mollalara bir «spasibo» ilə bir də divanxananın arxa qapısından içəri girməyə «rüsxət» versinlər. İyirmi-otuz il sora Hacıtərxanda deyil, Orenburqda mədrəseyi-hüseyniyyədə belə bir müsəlman qalmaz.

**Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə**

Qafqazda ermәni maarifi. Прогресъ у армянъ.



1909
1909 г.



1908
1908 г.



1907
1907 г.



1906
1906 г.



1905
1905 г.



1909
1909 г.



1908
1908 г.



1907
1907 г.



1906
1906 г.



1905
1905 г.

Qafqazda müsәlman maarifi. У мусульманъ.

Литог. С.Быхова